UOT: 334

# KƏND TƏSƏRRÜFATINA İNVESTİSİYA QOYULUŞUNUN İQTİSADİ SƏMƏRƏLİLİYİNİN YÜKSƏLDİLMƏSİ İSTİQAMƏTLƏRİ

**E.Q.ALLAHVERDİYEV**
**Azərbaycan Kooperasiya Universiteti**

*Məqalədə kənd təsərrüfatına investisiya qoyuluşunun iqtisadi səmərəliliyinin yüksəldilməsi istiqamətləri verilmişdir. Kənd təsərrüfatında müxtəlif sahələrin inkişafı üçün məhsuldarlığın yüksəldilməsinin zəruruliyi təhlil olunaraq təkliflər verilmişdir.*

***Açar sözlər:*** *kənd təsərrüfatı, investisiya, iqtisadi səmərəlilik, inkişaf, məhsuldarlıq, istehsal xərcləri*

Kənd təsərrüfatı məhsullarının, o cümlədən ərzaq məhsulları istehsalının artması üçün zəruri şərtlərdən biri müvafiq məhsullar üzrə məhsuldarlığın artmasıdır. Kənd təsərrüfatına investisiya qoyuluşunda əsas məqsəd – kənd təsərrüfatı məhsulları istehsalı həcminin artırılmasından ibarətdir. Məhsul istehsalının artımını əsas şərtlərindən biri əkinşilik mədəniyyətini yüksəltmək üçün hər bir bitkinin daim qayğısına qalmaqdır. Bu cür tədbirlərin kompleksində əsas yeri səmərəli əkinçilik mədəniyyəti dövriyyəsi tutur.

İstehsalın səmərəliliyinin artırılması, o cümlədən investisiya hesabına artırılması kənd təsərrüfatının inkişafı üçün ən vacib vəzifələrdən biridir. İnvestisiya qoyulacaq sahələrin və obyektlərin yerini müəyyənləşdirərkən və ən səmərəli iqtisadi layihələri seçərkən investisiyaların səmərəliliyi əvvəlcədən layihə mərhələsində məqsəd olaraq qarşıya qoyulmalıdır. Bu halda təqdim olunan investisiya layihələrindən əldə olunan mənfəətin istehsalın gələcək inkişafına yenidən yönəldilməsinə və dayanıqlı inkişafın təmin olunmasına imkan verəcəkdir. Qeyd edək ki, kapital dövriyyəsi nə qədər tez və sürətli həyata keçirilərsə, məhsul istehsalının inkişafı daha səmərəli olacaqdır.

Aqrar sahədə istehsalın intensivləşdirilməsi, yeni texnika və texnologiyaların tətbiqi, əmək məhsuldarlığının yüksəldilməsi, məhsul vahidi istehsalına material və əmək məsrəflərinin azaldılması, hər hektar sahədən və hər baş mal-qaradan əldə edilən məhsulun satışı və xidmətlərin səviyyəsinin yüksəldilməsi, aqrar sahədə iqtisadi səmərəliliyin yüksəldilməsinin əsas istiqamətləri hesab edilir.(3. Səh 540)

İnvestisiyaların səmərəliliyinin artırılması ümumi məhsul və xalis gəlirin həcminin artırılması, istehsal xərclərinin azaldılması və əmək məhsuldarlığının artırılması ilə ifadə olunur. Beləliklə, xammalın, materialların, enerjinin, xidmətlərə çəkilən xərclərin minimum həddə endirmək yolu ilə istehsal xərclərini azaldaraq xalis gəlirin artırılması mümkündür. Bu xərclərin formalaşmasında, kənd əmtəə istehsalçılarından əlavə, bir sıra digər sənaye və kənd təsərrüfatı təşkilatları öz qiymət və tariflərini müəyyənləşdirərək iştirak edirlər. Beləliklə istehsal xərclərinin artması qiymətlərin bahalaşmasına və nəticədə xalis gəlirlərin azalmasına gətirib çıxarır, qiymətlərin azalması isə əksinə xalis gəliri artırır.

Xalis gəlirin artması da kənd təsərrüfatı və sənaye məhsullarının qiymət səviyyəsinə təsir edir. Qiymət bərabərliyi sahələr arasında mübadilənin ekvivalentlik formasından biridir və bu məhsulların qiymətlərinin nisbəti ilə xarakterizə olunur. Optimal qiymətlərin pozulması isə uyğunsuzluğa gətirib çıxarır. Hal-hazırda, qiymətlərin uyğunsuzluğu kənd təsərrüfatının inkişafına maneə yaradan əsas səbəblərdən birinə çevrilib və kənd təsərrüfatı məhsulları istehsalının azalmasına və ya dayanmasına səbəb ola bilər.

Son illərdə kənd təsərrüfatı, meşə təsərrüfatı və balıqçılıqda əsas fondların artım sürəti kənd təsərrüfatında ümumi məhsulun artım sürətini ötüb keçmişdir. Belə ki, 2000-ci ildə kənd təsərrüfatına yararlı torpaq sahələrinin hər hektarına 555,7 manat əsas fondlar düşdüyü halda, həmin rəqəm 2005-ci ildə 631,4 manat, 2010-cu ildə 1069,8 manat, 2015-ci ildə 1332,4 manat və 2016-cı ildə isə 1497,6 manat olmuşdur. Göründüyü kimi əsas fondlar 2016-cı ildə 2000-ci ilə nisbətən 2,6 dəfə, 2005-ci ilə nisbətən 2,4 dəfə, 2010-cu ilə nisbətən 39,9%, 2015-ci ilə nisbətən isə 12,4% artmışdır. Ümumi məhsulun dəyəri isə 2016-cı ildə müvafiq illər üzrə 5,0 dəfə, 3,0 dəfə, 45% artmış, 2015-ci ilə nisbətən isə 0,1% azalmışdır.

Geniş tikinti və yeni obyektlərin istismara verilməsinə imkan verməyən pul vəsaitlərinin çatışmazlığı şəraitində ucuz yerli istehsal materiallarından istifadə edərək binaların və qurğuların yenidən qurulması məqsədəuyğundur.

Qeyd edək ki, əsas fondların düzgün istifadəsi ilk növbədə onların səmərəli təşkili və növləri arasında

düzgün mütənasibliyin yaradılmasını tələb edir. Həmin mütənasiblik pozulduqda onların ümumi həcminin artmasına baxmayaraq iqtisadi səmərəliliyi aşağı düşür. Yəni iqtisadi səmərəliliyin yüksəldilməsinə təsir edən əsas hissə "aktiv hissə" başqa növlərə nisbətən az artır və ümumi hissə içərisində kiçik xüsusi çəkiyə malik olur. Ümumi məhsul istehsalının artması isə əsasən aktiv hissənin yüksəldilməsilə əlaqədardır.

**Cədvəl 1.**

**İqtisadiyyatın sahələri üzrə əsas kapitala yönəldilmiş investisiya (milyon manat)**

| | 2012 | 2013 | 2014 | 2015 | 2016 | 2012-ci ilə nisbətən 2016-cı ildə %-lə |
|---|---|---|---|---|---|---|
| **Cəmi** | 15407,3 | 17850,8 | 17618,6 | 15957,0 | 15722,8 | 102,0 |
| Sənaye | 6039,9 | 7499,6 | 7639,5 | 8499,9 | 9949,8 | 164,7 |
| Kənd təsərrüfatı, meşə təsərrüfatı və balıqçılıq | 648,8 | 574,3 | 363,9 | 355,4 | 325,1 | 50,1 |
| Tikinti | 499,0 | 707,8 | 2221,7 | 2135,5 | 2831,8 | 5,7 dəfə |
| Nəqliyyat və anbar təsərrüfatı | 2621,1 | 3570,0 | 2440,6 | 2199,9 | 1392,3 | 53,1 |
| Informasiya və rabitə | 329,5 | 200,7 | 157,5 | 335,3 | 199,4 | 60,5 |
| Digər sahələr | 5269,0 | 5298,4 | 4795,4 | 2443,0 | 1074,4 | 20,4 |

*Cədvəl Azərbaycanın Kənd təsərrüfatı Statistik məcmuəsinin məlumatları əsasında müəllif tərəfindən tərtib edilmişdir Bakı-2017*

Araşdırmalar göstərir ki, əsas fondların bütün növləri istehsal prosesində eyni səviyyədə iştirak etmir. Məsələn çox illik əkmələrdə ağaclar əkildiyi vaxtdan əsas fondlara aid edilir, lakin məhsul verənə qədər (3-4 il) istehsal prosesində iştirak etmir, yəni bar verənlər qrupuna aid edilmir. Əsas məhsuldar dövrü isə 5-6 ildən sonra başlanır. Bundan başqa bir çox istehsal təyinatlı tikili və qurğuları məhsul istehsalına dolayı təsir edir (heyvandarlıq binaları, texnikitəmir yerləri) və ya istehsal olunuş məhsulun saxlanılmasında istifadə olunan anbarlar. Son illərdə heydarlıq komplekslərinin, aqroparkların və loqistika mərkəzlərin fəaliyyətinin genişləndirilməsi bu kimi tikili və qurğuların inkişafını sürətləndirmişdir. Bunlardan fərqli olaraq əmək alətləri (texnika), nəqliyyat vasitələri, invertar və qurğular hansılar ki, bu gün istehsalçıların əsas istifadəsindədir və istehsal prosesində bir başa iştirak edir və kənd təsərrüfatı istehsalının iqtisadi səmərəliliyinə təsir göstərir. Əsas nəticə isə istehsal fondlarının hansı növlərinin daha sürətlə artmasından irəli gəlir.

Onu da qeyd edək ki, əsas fondlar ayrılıqda götürülmüş halda məhsul istehsalı prosesini həyata keçirə bilməz. Məlumdur ki, istehsal prosesini həyata keçirməkdə əsas fondlarla bərabər müəyyən miqdarda dövriyyə fondlarının da oması tələb olunur. Məsələn əsas dondların həcmi məhsuldar heyvanların sayının artması ilə yüksələ bilər (baş sayı artar,cins yaxşılaşar). Əgər onlarla bərabər yem istehsalı artmazsa əsas fondların artmasından iqtisadi səmərəlilik əldə olunmaz. Eyni zamanda, belə bir vəziyyət əkinçilik üçün də xarakterikdir. Yəni əmək alətlərinin dəyəri artdığına baxmayaraq, torpağa tələb olunan miqdarda gübrə verilməzsə və aqrotexniki qaydalara düzgüm əməl olunmazsa məhsulun fond tutumu yüksələr. İqtisadiyyatın sahələri üzrə əsas kapitala yönəldilmiş investisiya cədvəl 1-də verilmişdir.

Statistik məlumatların təhlili göstərir ki, əsas kapitala yönəldilmiş investisiya digər sahələrlə müqayisədə kənd təsərrüfatı, meşə təsərrüfatı və balıqçılıq üzrə ən az xüsusi çəkiyə malikdir. Kənd təsərrüfatının riskli bir sahə kimi formalaşması və burada əldə ediləcək gəlirin müəyyən müddət ərzində əldə edilməsi investor tərəfindən cəlbedici görünmür. Məhz bu səbəbdən də 2016-cı ildə kənd təsərrüfatı, meşə təsərrüfatı və balıqçılığa investisiya qoyuluşu əvvəlki illərlə müqayisədə aşağı düşmüşdür.

İnvestisiya qoyuluşunun iqtisadi səmərəliliyinin kənd təsərrüfatında getdikcə azalması istehsal olunmuş ümumi məhsulun dəyərinə nisbətən investisiya qoyuluşunun daha sürətlə artması ilə izah olunur. Qeyd edək ki, kənd təsərrüfatında əsas kapitala yönləndirilmiş investisiya artımı digər sahələrlə müqayisədə və ümumi məhsulun artımı ilə müqayisədə xeyli aşağıdır. Belə bir fərqin yaranması əsas fondlardan istiqfadənin iqtisadi səmərəliliyinin yüksək olduğu anlamına gəlmir, burada əsas görünən tərəf istehsal resurslarının çatışmazlığı səbəbindən istehsalın və sahədən məhsuldarlığın gözlənilən nəticələrdən aşağı olmasına gətirib çıxarır.

Kənd təsərrüfatının inkişaf etdirilməsinin başlıca vəzifələrindən biri də innovativ texnologiyalardan və müasir texnikalardan istifadənin yüksək inkişaf tempi, əmək ehtiyatarından istifadənin düzgün təşkili, əsas fondlardan və investisiya qoyuluşundan istifadənin yaxşılaşdırlması və istehsal olunmuş məhsulun keyfiyyətinin yüksəldilməsi əsasında istehsalın iqtisadi səmərəliliyinin artırlmasından ibarətdir.

Kənd təsərrüfatının hərtərəfli intensivləşdirilməsi onun əsas istehsal vasitəsi olan torpaqla sıxı surətdə əlaqədardır.Torpağın düzgün istifadə olunması birinci növbədə texnikanın istehsalata səmərəli tətbiqinə imkan verən və

bununla da kəsərrüfatının iqtisadiyytanı yüksəltmək üçün şərait yaradan əsas amillərdən biridir.

Kənd təsərrüfatı bitkilərinin məhsuldarlığı torpağın keyfiyyətindən və ona sərf olunan əmək məsarifindən asılıdır. Məhsul istehsalına əmək məsarifi isə mövcud əsas fondlardan (əsasən istehsalat təyinatlı əsas fondlardan) necə istifadə olunmasını göstərir. İstehsalat təyinatlı əsas fondların istehsala tətbiqi torpaqdan istifadə ilə qırılmaz surətdə bağlıdır. Onların iqtisadi səmərəliliyi isə kənd təsərrüfatına yararlı torpaq sahələrinin məhsuldarlığından asılıdır. Deməli, müəyyən torpaq sahəsində istehsal olunan məhsulun həcmini artırmaqla bərabər torpaqdan istifadə səviyyəsini genişləndirmək və onun məhsuldarlığını yüksəltmək lazımdır. Elə buna görə də əsas fondlardan istifadənin yaxşılaşdırlmasından danışarkən mütləq təsərrüfatların malik olduğu torpaqların sahəsini, keyfiyyətini və məhsuldarlığını qısa da olsa nəzərdən keçirmək lazım gəlir.

Torpaqdan səmərəli istifadə olunması hər şeydən əvvəl özünü məhsuldarlığın aqrotexniki qaydalara uyğun surətdə artırılmasında göstərir. Yəni, kənd təsərrüfatına yararlı torpaq sahələrindən əldə olunan məhsulun həcmi ardıcıl olaraq artır. Torpaqdan istifadə səviyyəsinin yaxşılaşdırılmasında başlıca məqsəd məhsuldarlığın artırılmasından ibarətdir. Torpağın məhsuldarlığının artırılması isə bitkiçilik məhsulları istehsalının artırılması ilə bərabər, heyvandarlıq məhsullarının da artırılması deməkdir. Heyvandarlıq məhsullarının çoxalması yem istehsalının artırılmasına əsaslanır. Deməli, ümumilikdə torpağın məhsuldarlığının artması yem bitkiləri əkin sahəsinin də məhsuldarlığının artmasına səbəb olur. Yem bitkiləri istehsalının artırılması isə heyvandarlıq məhsulları olan ətin, südün, yağın və s. artırılması üçün əsas mənbə təşkil edir.

Torpağın məhsuldarlığının artırılması birinci növbədə yararlı torpaqların və xüsusən əkin sahələrinin quruluşunun səmərəli təşkilindən asılıdır. Burada kənd təsərrüfatına yararlı torpaq sahələri içərisində əkin sahələrinin xüsusi çəkisinin artırılması başlıca məsələdir. Statistik məlumatların təhlili göstərir ki, kənd təsərrüfatına yararlı torpaq sahəsinin tərkibində əkin sahəsinin xüsusi çəkisi 2012-ci ildə 38,9%, 2013-cü ildə 39,5%, 2014-cü ildə 39,5%, 2015-ci ildə 39,8% və 2016-cı ildə isə 41,0% təşkil etmişdir. Göründüyü kimi əkin sahəsinin xüsisi çəkisində artım müşahidə olunur, lakin bu otlaq və örüş yerləri hesabına baş verməməlidir. Əkin sahələrinin genişlənməsi məhsul istehsalının artmasında və növbəli əkin sisteminin inkişafında mühüm əhəmiyyət kəsb edir

Əkin sahəsinin artırılması becərilən bitki növlərinin quruluşunun dəyişdirilməsi üçün imkan yaradan amillərdən biridir. Əksəriyyət hallarda isə bu amil kənd təsərrüfatının inkişafın əsas rol oynayan amil kimi qəbul edilir. Əkin sahəsinin quruluşunun səmərəli təşkili imkan verir ki, bu və ya digər təsərrüfat formalarında təbii-iqtisadi şərait nəzərə alınmaqla o bitkilər əkilsin ki, onların becərilməsi üçün daha az əmək və material səfr edilərək daha çox məhsul istehsal olunsun. Belə bir şəraitdə təsərrüfatın ixtisaslaşmasını da nəzərə almaq lazımdır. Onu da qeyd edək ki, mövcud təsərrüfat formalarının kiçık həcmli olması (0,5-3 hektar ) əkin sahəsinin quruluşunun səmərəli təşkilində ciddi çətinliklər yaradır.

Hər bir torpaq sahəsinin səmərəli istifadə olunması və orada əkilmiş bitkinin daha yaxşı böyüməsi üçün təsərrüfatın ərazisinin düzgün təşkil olunması əsas məsələlərdən biridir. Yəni, təsərrüfatın daxilində istehsal sahələri arasında torpağın bölgüsünün düzgün aparılması və elmi cəhətdən əsaslandırılmış növbəli əkin sisteminin həyata keçirilməsi də torpaqdan istifadənin səmərəliliyini yüksəldir.

Təsərrüfatlarda məhsul istehsalına çəkilən xərclərin düzgün hesablanması və aşağı salınması təsərrüfatın qənaətlə və səmərəli idarə olunmasında mühüm vasitə olmaqla ilkin uçotun aparılmasını şərtləndirir.

Bitkiçilik məhsulları istehsalının artırılmasında və onun maya dəyərinin aşağı salınmasında gübrələrdən səmərəli istifadə olunması da böyük əhəmiyyət kəsb edir. Mineral gübrələrdən düzgün istifadə edilməsi sahədən məhsuldarlığı artırmaqla məhsul istehsalına çəkilən xərclərin aşağı düşməsinə səbəb olur ki, bu da məhsulun rəqabət qabiliyyətini artırmış olur.

Təsərrüfatlarda istehsalın iqtisadi səmərəliliyini yüksəltmək üçün bitkiçilik məhsulları ilə yanaşı, heyvandarlıq məhsullarının da maya dəyərinin aşağı salınması böyük əhəmiyyətə malikdir.

Tədqiqat materiallarının təhlili göstərir ki, heyvandarlıqda məhsuldarlığın artırılması və maya dəyərinin səviyyəsi heyvanların yemlə yaxşı təmin edilməsindən çox asılıdır.

Kənd təsərrfütaında istehsalın iqtisadi səmərəliliyinin artırılması üçün ən mühüm məsələlərdən biri də istehsalçılarda kənd təsərrüfatına marağın oyanmasından, istehsalçıda yaranan inamdan asılıdır. Bu məqsədlə dövlət tərəfindən məhsul istehsalçılarına diferensial subsidiyaların, güzəştli kreditlərin veriməsini, gənc ailələrin kəndlərdə qalıb işləməsi üçün əlavə stimullaşdırıcı tədbirlərin görülməsini məqsəduyğun hesab edirik.

## ƏDƏBİYYAT

**1.** "Azərbaycan Respublikasında kənd təsərrüfatı məhsullarının istehsalına və emalına dair Strateji Yol Xəritəsi", Azərbaycan Respublikası Prezidentinin 6 dekabr 2016-cı il tarixli 1138 saylı Fərmanı., Bakı-2016., 177 s. 2. "Azərbaycanın Kənd Təsərrüfatı" DSK-nin məlumatları Bakı-2017. 3. İ.H.İbrahimov., Aqrar sahənin iqtisadiyyatı., (monoqrafiya), Bakı-2016., 653 s**.**

### Пути повышения экономической эффективности инвестиций в сельское хозяйство

**Э.Г.Аллахвердиев**

В статье проанализированы пути повышения экономической эффективности инвестиций в сельское хозяйство. Были предложены рекомендации по необходимости повышения производительности для развития различных отраслей сельского хозяйства.

**Ключевые слова:** сельское хозяйство, инвестиции, экономическая эффективность, развитие, производительность, издержки производства

### The ways for increasing the economic efficiency of investment in agriculture

**E.G.Allahverdiyev**

The article outlines the ways to increase the economic efficiency of investment in agriculture. The necessity of increasing productivity for the development of various sectors in agriculture was analyzed and proposals were given.

***Key words****: agriculture, investment, economic efficiency, development, productivity, production cost.*

